**Mündəricat**

# Müqəddimə

Tarix boyu peyğəmbərlər və övliyalar barəsində ifrat (quluv) edənlərin varlığı inkar olunmazdır. Hələ yəhudi qövmü zamanında Hz.Üzeyirə (ə), yaxud da məsihilərin Hz.İsa Məsihə (ə) "Allahın oğlu" demələri buna bariz nümunədir. Ancaq əfsuslar olsun ki, bəzi cahil və nadan şəxslər bu böyük günahı 12 imam şiələrinə ünvanlayaraq şiələri ifrat və imamların vəsvində həddlərini aşmaqda ittiham etmişlər. Nümunə olaraq bunların bir neçəsinə işarə edək:

Əhməd Əmin Misri yazır:

**"İfratçı şiələr Əlinin (ə) Peyğəmbərdən (s) sonra ən fəzilətli şəxs və məsum olması iddiası ilə kifayətlənməyib onu ilahiləşdirərək uluhiyyətinə (ilahlığına) qail oldular".**[1]

Zübeydi belə yazır:

[1] Fəcrul İslam, səh. 330

**“İmamiyyə (yaxud Cəfəri, 12 imamçılar) şiənin ifratçı və vəsfdə həddi aşan (quluv edən) firqəsidir”.**[2]

Doktor Kamil Mustafa yazır:

**“Şiənin ifratçıları şiəliyin əsl əqaidini və o cümlədən, bəda, rəcət, ismət və elmi-lədunni (Allah tərəfindən əta olunan və hər şeyi əhatə edən eləm) məsələlərini təsis etdilər ki, sonralar bu məsələlər şiəliyin əsası kimi tanındı”.**[3]

Əlbəttə, bu deyilənlərin (rəcət, bəda, elmi-lədunni və s.) hamısı ayrı-ayrılıqda geniş müzakirə mövzusudur ki, bizim mövzumuz quluv (vəsfdə ifrat və həddi aşma) olduğuna görə onlara toxunmayacağıq.

Əgər ömür vəfa edərsə, inşaallah bu məsələlər barəsində də əhatəli yazılar təqdim edəcəyik.

---

[2] Tarixul-ərus, cild 8, səh.194.

[3] Əs-sillətu bəyn ət-təsəvvufu vət-təşəyyu (Quluv fəsli)

# Quluv nədir

Quluv (غلو) sözü təqsirin (تقصر) (azaltma, həddindən az) antonimi olub lüğətdə ifrat, həddi aşma, mənasındadır.[4] Yəni, bir şeyin yaxud da bir kəsin xüsusiyyətlərinin olduğundan daha artıq vəsf olunmasına deyilir. Bu sözün terminoloji mənası isə Peyğəmbər (s), Allah övliyaları və imamlar barəsində ifrat (həddi aşma), mübaliğə (şişirtmə) edərək onların uluhiyyət və rübubiyyətinə (ilahiləşdirilərək Allah məqamına çatdırılmasına) etiqaddan ibarətdir.

Qurani-Kərim əhli-kitabı Hz.Məsih barəsində ifrat etməkdən çəkindirərək buyurur:

قُلْ يَا أَهْلَ الْكِتَابِ لَا تَغْلُوا فِي دِينِكُمْ غَيْرَ الْحَقِّ ...

**"De: Ey kitab əhli! Dininizdə haqsız olaraq ifrata varmayın."**[5]

Görəsən, məsihilərin ifratı nədən ibarət idi?! Onlar dinlərində hansı ifrata yol vermişdilər?!

---

[4] Lisanül-ərəb, cild 15, səh.132

[5] Maidə surəsi, 77-ci ayə.

Məsihilər Hz.İsa Məsihi (ə) ilahiləşdirərək onun rübubiyyətinə inanırdılar. Elə ona görə də başqa bir ayədə belə buyurulur:

لَقَدْ كَفَرَ الَّذِينَ قَالُوا إِنَّ اللَّهَ هُوَ الْمَسِيحُ ابْنُ مَرْيَمَ ...

**“Şübhəsiz ki, “Allah Məryəm oğlu Məsihdir!” deyənlər kafir oldular”.**[6]

---

[6] Maidə surəsi, 72-ci ayə.

## Quluvun əlamətləri

Quluvun əlamət və nişanələri barəsində danışıldıqda ümumi olaraq aşağıdakıları qeyd etmək olar:

1. Hz.Peyğəmbərin (s) yaxud da hər hansı başqa bir övliyaların uluhiyyətinə (ilahlığına) inam.

2. Aləmlərin idarəsinin (tədbiri və nizam-intizamının idarə olunmasının) Peyğəmbər (s), Əli (ə) və ya digər əhli-beyt imamlarının, yaxud da başqa övliyaların öhdəsinə qoyulmasına inam.

3. Hz.Əli (ə) və ya başqa imamların yaxud da camaatdan olan hər hansısa bir fərdin nübuvvətinə (peyğəmbərliyinə) inam.

4. Bir kəsin, ona vəhy və ya ilham olmadan qeyb aləmindən agah olmasına inam.

5. Əhli-beyt imamlarına olan məhəbbət və mərifətin insanı Allaha ibadətdən və vacib olanları yerinə yetirməkdən azad etməsinə inam.[7]

---

[7] Biharul-ənvar, cild 25, səh.346. "Quluvun əlamətlərinin bəyanı"

Amma əvvəldə də qeyd etdiyimiz (rəcət, bəda, elmi-lədünni və s.) əqidə məsələləri əqli və nəqli (hədislər) dəlillərə söykənərək isbat olunublarsa, artıq onlara ifrat və həddi aşma (quluv) demək olmaz, bu məsələlər elə həqiqətin özüdür.

# Əhli-beyt imamlarının ifrat və ifratçılara münasibətləri

İmamlar həmişə ifratçılara (qalilərə) qarşı şiddətli mövqe tutaraq onlara və əqidələrinə qarşı daim etiraz edirdilər.

İmam Sadiq (ə) buyurur:

**“Öz cavanlarınızı ifratçıların xətasından xəbərdar edin, məbada onların əqidəsini yaşadalar! Ona görə ki, qulat[8] Allahın ən pis xəlqidir. Allahın əzəmətini kiçildərək, onun bəndələri üçün rübubiyyətə etiqad edirlər.”** [9]

Hz.Əli (ə) qulatlara qarşı şiddətli mövqedə duraraq belə deyərdi:

**“İlahi! Məryəm oğlu İsa (ə) nəsranilərdən bezarlıq etdiyi kimi mən də qulatlardan bezarlıq edərək sənə pənah aparıram! İlahi pərvərdigara !**

---

[8] Bu ifratçı əqidənin davamçılarına qulat, qali deyilir.

[9] Biharul-ənvar, cild 25, səh. 265. Şeyx Tusinin “Əmali” kitabından nəqlə əsasən

**Onları əbədi olaraq xar və zəlil et! Onların heç birinə kömək etmə!”**[10]

İmam Sadiq (ə) buyurur:

**“Abdullah ibn Səbəyə** [11]**Allahın lənəti olsun ki, Hz.Əli (ə) barəsində rübubiyyətə inanırdı (Hz.Əlini (ə) ilahlaşdırmışdı). And olsun Allaha ki, Əli (ə) Allahın ən itaətkar bəndəsi olmuşdur. Vay olsun o kəsə ki, bizlərə yalan nisbət verir! Bəzi dəstələr bizim barəmizdə elə şeylər**

---

[10] Həmin mənbə

[11] Abdullah ibn Səbə həmin Yəmənli yəhudi idi ki, vəhhabilər və əhli-sünnədən bəziləri onu şiə məzhəbinin banisi kimi tanıtdıraraq şiə məzhəbinin Peyğəmbərdən (s) sonra bir yəhudi tərəfindən yaradıldığını əllərində əsas tutaraq şiə (imamiyyə, cəfəri) məzhəbini İslam məzhəbləri və firqələri arasında ən batil məzhəb hesab edirlər. Amma hədisdə görürük ki, şiə məzhəbinin 6-ci imamı hesab olunan Cəfər Sadiq (ə) İbn Səbəyə lənət oxuyaraq onu tənqid edir. Tarix boyu istər dini liderlər, istərsə də hansısa dövlətin baniləri öz ardıcılları tərəfindən xoş niyyətlə yad ediliblər, ancaq gördüyünüz kimi İmam Sadiq (ə) İbn Səbəyə lənət oxuyur. Bir əqidənin banisi ardıcılları tərəfindən necə bu cür yad edilə bilər? Hansı əhli-sünnə firqəsi öz imamını lənətlə yad edir? Əlbəttə ki, heç biri. Elə bu da şiəyə vurulan böhtanların açıq aşkar cavabı ola bilər. Bu barədə əlavə məlumat üçün Əllamə Seyyid Mürtəza Əskərinin “Abdullah ibn Səbə” adlı kitabına müraciət edə bilərsiz. Mərhum Əllamə bu kitabda əhli-sünnənin mötəbər mənbələrinə əsasən şiəyə vurulan bu böhtanı tamamilə rədd etmişdir.

**söyləyirlər ki, bizim özümüz o deyilənlərə qail deyilik .**[12]

Yenə Həzrət başqa yerdə belə buyurur: **“Allahın lənəti olsun bizi peyğəmbər bilən kəsə!”**[13]

---

[12] Biharul-ənvar, cild 25, səh.286. Kəşşinin “Rical” kitabından nəqlə əsasən.
[13] Biharul ənvar, cild 25, səh.296. Kəşşinin “Rical” kitabından nəqlə əsasən.

## İmamiyyə alim və mütəfəkkirlərinin qalilərlə müxalifətçiliyi

İmamiyyə alimləri də qalilərlə qarşı-qarşıya duraraq onları kafir və müşrik bilmişlər.

**1.** Şeyx Səduq (r.ə) belə deyir:

**"Bizim qulat və müvəffizə barəsində əqidəmiz, onların Allaha küfr etməsindən ibarətdir."** [14]

**2.** Şeyx Müfid (r.ə) belə deyir:

**"Qulat İslam dinində peyda olmuş bir qrupdur ki, Əmirəlmöminin Əli (ə) və onun nəslindən olan imamlara uluhiyyət və peyğəmbərlik nisbəti verirlər. Onlar yollarını azmış və kafirdirlər. Hz.Əli (ə) onların qətlinə hökm etmişdir. Digər imamlar da onları kafir və dindən çıxmış hesab edirdilər."**

**3.** Əllamə Hilli (r.ə) belə deyir:

**"Qulatların bir qrupu Hz.Əlinin (ə) üluhiyyətinə, digərləri isə nübuvvətinə inanıdılar. Bu inanclar batildir. Çünki, biz isbat**

[14] Əl-Etiqadat, səh.71

**etmişik ki, Allah cism deyil və Allah barəsində hülul (yəni, Allah insanın vucuduna daxil olması və insan şəklinə düşməsi) və ittihad (yəni xaliq ilə məxluqun eynilik və birliyi) mümkünsüz və qəbul olunmazdır. Həmçinin, Hz.Məhəmmədin (s) peyğəmbərlərin sonuncusu və xətmi olduğu da Quran və hədislər tərəfindən açıq-aydın olaraq sübuta yetirilib.”**

Amma əfsuslar olsun ki, bir qrup cahil və radikal məzhəbçilər bu böyük şirki şiəyə ünvanlayaraq onları hədlərini aşmaqda, Hz.Əli (s) və onun nəslindən olan imamları bəşəriyyətə rəhmət olan Hz.Peyğəmbərdən (s) üstün tutaraq ilahiləşdirməkdə ittiham etmişlər.

Bilməliyik ki, üluhiyyət və peyğəmbərliyin meyar və xüsusiyyətlərinə aid olmayan şeylərə inamın ifratçılıq və qaliliklə heç bir əlaqəsi yoxdur. Əksinə, bu inancda olanların əqidələrinin həqiqət olmasına dair kifayət qədər qaneedici dəlilləri və sübutları vardır. Məsələn, Əhli-beyt barəsində ismət, vilayət, rəcət, elmi-lədunni və s. məsələlərə etiqadın olması həqiqətdir və bunların isbatı üçün tutarlı dəlillər də qeyd olunub. Ona görə heç kim

bu cür inanca görə qalilikdə və həddini aşmaqda ittiham oluna bilməz.

Ümumiyyətlə ismət, kəramət, qeybdən agah olmaq və s. səciyyəvi xüsusiyyətlər Allah dostlarının məqamlarındandır və təkcə peyğəmbər və imamlara məxsus deyil. Quran Hz.Məryəmin (s.ə) ismətindən xəbər verərək buyurur:

... يَا مَرْيَمُ إِنَّ اللَّهَ اصْطَفَاكِ وَطَهَّرَكِ وَاصْطَفَاكِ عَلَىٰ نِسَاءِ الْعَالَمِينَ ...

**"Ey Məryəm! Həqiqətən Allah səni seçmiş, (eyblərdən) təmizləmiş və bütün dünya qadınlarından üstün tutmuşdur".**[15]

Həmçinin Hz.Süleymanın (ə) səhabələrindən biri olan Asif ibn Bərxiyanın kəraməti barəsində xəbər verir:

قَالَ الَّذِي عِنْدَهُ عِلْمٌ مِنَ الْكِتَابِ أَنَا آتِيكَ بِهِ قَبْلَ أَنْ يَرْتَدَّ إِلَيْكَ طَرْفُكَ ...

**"Kitabın elmindən (İlahi kitabdan, lövhi-məhfuzdan) bir qədər xəbəri olan birisi dedi: "Mən onu sənə bir göz qırpımında gətirərəm!"** [16]

---

[15] Ali-İmran surəsi, 42-ci ayə
[16] Nəml surəsi, 40-cı ayə

Hədislərimizdə **"Mühəddəs"** ünvanı və adı ilə tanınan bəzi kəslərdən söhbət açılır. "Mühəddəs" peyğəmbərlik məqamına malik olmadan mələkləri yuxuda yaxud da aşkarda müşahidə edən və ona qeyb aləmindən bəzi şeylər ilham olunan kəsə deyilir.

İmam Məhəmməd bin İsmayıl Buxari Əbu Hüreyrədən nəql edir ki, Peyğəmbər (s) buyurmuşdur:

**"Bəni İsrailin arasında elə şəxslər var idi ki, peyğəmbərlik məqamında olmadan onlara qeyb aləmindən danışılırdı".**[17]

Həmçinin şiə hədislərində də məsum imamlar "Mühəddəs" və Xanım Zəhra (s.ə) "Mühəddəsə" kimi yad olunur.

Mərhum Kuleyni "Üsuli-Kafi", Əllamə Məclisi isə "Biharul-Ənvar" kitabında bu ünvanda bir çox hədisləri toplamışlar.

Deməli, məlum oldu ki, ismət, elmi-lədunniyə şamil olan qeyb aləmindən xəbər vermə və s. qeyd

---

[17] Səhihul-Buxari, cild 2, səh.295.

olunan məsələlərə inam barədə dinin icazəsi var və bunlar heç də ifrat və həddi aşma (quluv) hesab olunmur.

## Quluvun (ifratın) həddi və ölçüsü

Qeyd etdik ki, "quluv" lüğətdə  ifrat və həddi aşma kimi məna olunur. İndi isə görək bu hədd və miqdar nədən ibarətdir ki, onu aşmaq quluvdur, ona çatmamaq isə təqsir (azaltma həddindən az).

Bu məsələdə 4 ehtimal irəli sürülmüşdür:

1. **Hədd və qədər (mizan, ölçü) deyildikdə, nəzərdə tutulan meyar ürfdür (ictimaiyyətdir). Yəni, hər bir şeydə ürfün dərkini nəzərə alaraq həddi aşma müşahidə olunsa  quluvdur.**

Bu ehtimal batildir və bir dindar insan onu heç vaxt qəbul edə bilməz. Bu hədd və ölçü o kəslər üçündür ki, dinə heç bir qədir-qiymət verməyərək bütün hökmləri camaatın nəzəri ilə ölçmək istəyirlər.

2. **Səhabələrin məqamı. Bu mənada ki, səhabələr üçün başqalarına aid etmədiyimiz bir məqama inanaq. Bu məqam hər bir məsələdə bizim üçün həmən hədd və ölçü xarakteri daşıyır.**

**Həddi aşmanı (quluvu) da bu məqama əsasən təyin edirik və səhabə olmayanlar üçün də bunu hədd olaraq təyin edirik.**

Əvvəla, qeyd edək ki, bu ehtimalın özündə belə səhabə barəsində bir növ ifrat düşüncə tərzi hökm sürməkdədir. Səhabənin məqamı barədə ifrata varmaqla bir hədd təyin edib bunu dində ifrat və həddi aşma (quluv) üçün meyar kimi təqdim etmək qəbul edilməzdir.

Bu ehtimalda qeyd olunan ölçü və hədd üçün də heç bir dəlilimiz yoxdur. Belə ki, dəlil iddianın eynisidir. Nəzərə alsaq ki, iddiamız səhabənin məqamıdır, lakin bu iddianın isbatı üçün gətirdiyimiz arqument də yenə də iddianın özü, yəni, səhabənin məqam və mənzilətidir (Məntiqi baxımdan dəlil iddianın eynisi olduğu zaman batil sayılır).

3. **Hədd və ölçü dedikdə, nəzərdə tutulan əhli-sünnə alimlərinin kitab və sünnədən dərk etdikləri bəzi məsələlər ola bilər ki, quluvun hədd və mizanı bu məsələlərə əsasən təyin edilmiş olsun.**

Ancaq bu ehtimalın da heç bir arqumenti yoxdur. İndiyə qədər əlimizdə elə bir sənəd, dəlil və sübut yoxdur ki, hansısa hədd və ölçünün təyini ümmətin bir qrupunun dərk etdikləri məsələlər əsasında olsun.

4. **Hədd və ölçü deyildikdə, nəzərdə tutulan kitab və sünnənin özüdür.**

Elə ən səhih ehtimal da budur ki, əql, sünnə və həmçinin Quran da onu təsdiqləyir. Doğrudan da bu məsələlərdə hədd və ölçünü şəriət və din təyin etməlidir.

## Haqqı etiraf

Bəzi insaflı əhli-sünnə alimləri ifratçılar və şiə arasında olan fərqləri qeyd edərək şiələri ittiham edən sələfi-vəhhabiləri və onların başqa müxaliflərini tənqid etmişlər.

Misirli sünnü alim, Ənvər Cündi bu barədə belə yazır:

**"Şiə imamlarının qulatlarla şiddətli müxalifətini və onlar barəsində xəbərdarlıq etmələrini nəzərə alaraq, agah bir tədqiqatçının bunların (şiə ilə qulat) arasında fərq qoyması lazımdır".**[18]

Başqa bir Misirli alim Dr. Əli Əbdülvahid Vafi bu barədə belə yazır:

**"Bizim yazarlardan çoxu Cəfəri şiələri (yəni imamiyyə, 12 imamçlar) ilə şiənin başqa firqələri arasında fərq qoymayıb məsələni qarışdırıblar".**[19]

İmam Məhəmməd Ğəzzali şiələr və qalilər arasında fərq qoymayanların problemlərini həll

---

[18] Əl-İslam vəl hərəkətüt-tarix, səh.421

[19] Beyn əş-şiə vəs-sünni, səh.11.

etmək üçün çoxlu zəhmət çəkmişdir. O, bu barədə belə deyir:

**“Şiə və qulat arasında fərq qoymayan bu yalançılardan bəziləri şiələrin Əlinin (ə), sünnilərin isə Hz.Peyğəmbərin (s) ardıcılları olduğu və şiələrin Əlini (ə) peyğəmbərlik məqamına daha layiqli bilmələri və peyğəmbərliyin səhvən Hz.Rəsulullaha (s) verilməsinə imanları barədə şaiyələr yayıblar. Bu deyilənlər ən pis böhtan və ən alçaq yalandır”.**[20]

İmam Ğəzzali başqa bir yerdə isə belə deyir:

**“Bu cür şəxslərdən bəziləri həqiqətləri gizlətmək üçün yalandan və nahaqq olaraq Quran ayələrində nöqsanların olmasına inamı şiəyə aid etmişlər”.**[21]

Əhli-sünnənin digər görkəmli alimlərindən biri Əbdül Həlim Cündi, belə yazır:

**“Qaliliyi şiəyə aid edərək bu işlə başqalarının çıxarışlarında mənfi təsir qoydular. Şiələrə elə**

[20] Risalətüt-təqrib, səh.250
[21] Leylətun-minəl-islam, səh.48

**töhmət və böhtanlar vuruldu ki, məsələn,"imam elə Allahın özüdür" və bu kimi başqa cəfəngiyyatlardan şiənin özü də bezardır".[22]**

Əhli-sünnənin başqa bir görkəmli mütəfəkkiri Salim Behnisavi belə deyir:

**"Əhli-sünnənin əlində olan bu günkü Quran elə həmin qurandır ki, bu gün hər bir şiənin evində və məscidlərindədir".[23]**

Dr.Əli Əbdülvahid Vafi başqa bir yerdə isə belə yazır:

**"Biz sünnilər və şiələr arasındakı ixtilaflara nə qədər böyük cilvə versələr belə, ixtilaflar şəri ictihaddan artıq və xaric olmayacaq".[24]**

---

[22] Əl-İmam Cəfər Əs-Sadiq (ə), səh.235.
[23] Beyn əş-şiə vəs-sünni, səh.4.
[24] Əs-sünnətül Muftəra əleyha , səh.6

## Şiələr ilə qulatlar arasında eynilik nəzəriyyəsinin yaranma amilləri

Bu fikir və nəzəriyyənin yaranmasında üç cəhətə işarə etmək olar:

1. İfrat və həddi aşmanın (quluvun) mənasının düzgün anlaşılmaması və onun həqiqi mənasını bilməmək.
2. "Şiə" məfhumunun və həqiqi şiəliyin tanınmaması.
3. İmamiyyənin ifrat və ifratçılığa qarşı tutduqları mövqedən xəbərsizlik.

İfratçılıq elə bir əqidə idi ki, İslamın bütün məzhəbləri onunla müxalifətçilik edirdi. Çünki diqqət etsək, Quran və sünnənin də bu əqidə ilə şiddətli mübarizəyə qalxdığını görərik. Ancaq əhlü-sünnə camaatının məxsusən sələfi-vəhhabilərin əsaslı problemi ifratın doğru-düzgün tərifini, habelə hədd və ölçüsünü, qaydalarını tanımamaqdan ibarətdir.

Sələfi-vəhhabi firqəsi yaranandan bu günə qədər "Quluv" (ifrat və həddi aşma) məfhumuna elə

qeyri-adi məna və təriflər veriblər ki, bu təriflərin nəticəsi digər İslam məzhəblərini, xüsusilə də şiəni ittiham etməkdən başqa bir şey olmayıb.

Sünni qabaqcıllarından olan İmam Muhəmməd Ğəzzali vəhhabilərin dindən dərk etdiklərini qeyri-adi, cahilanə dərk və çıxarış hesab edirdi. O, deyir:

"**İslami dəyərlər bir neçə cəhətdən təhdid olunurdu. Bu təhdidlərin ən dəhşətlisi və qorxulusu isə islahatçılıq libası altında gizlənmiş həddən artıq ifratçı məzhəbi təfəkkürlərdir ki, hətta (saleh sələflərin yolunu tutan) bəzi sələfilər də bundan bezardırlar.**"

## Şiənin övliyalar barədə etiqadı

Şiələrin inanclarına görə Allah dostları və onların öndəri olan Hz.Peyğəmbər (s) Allahın bəndələridirlər. Allahın izni olmadan heç nəyə (zərər, xeyir, ölüm, həyat verməyə və s. bu kimi şeylərə) malik deyirlər. Buna dəlilimiz Allah-taalanın Quranda buyurduğudur:

قُلْ لَا أَمْلِكُ لِنَفْسِي نَفْعًا وَلَا ضَرًّا إِلَّا مَا شَاءَ اللَّهُ . . .

**“De: "Mən Alahın istədiyindən başqa özümə nə bir xeyir, nə də bir zərər verə bilərəm!”**[25]

Övliyalar, yaxud da Hz.Peyğəmbər (s) bəşər olmaları ilə yanaşı başqalarına əta olunmayan bəzi imtiyazlara malikdirlər. Peyğəmbər (s) və imamlar bəşər olsalar da bəşərdən üstündürlər. Əgər bunu belə də qəbul etməsək, o zaman inancımız cahiliyyət dönəminin müşrikləri ilə eyni olacaq. Ona görə ki, onlar da peyğəmbərləri özləri kimi sıradan bir bəşər hesab edirdilər. Məslən, Allah buyurur:

Hz.Nuhun qövmü barəsində:

---

[25] Əraf surəsi, 188-ci ayə.

فَقَالَ الْمَلَأُ الَّذِينَ كَفَرُوا مِنْ قَوْمِهِ مَا نَرَاكَ إِلَّا بَشَرًا مِثْلَنَا ...

**“Onun qövmünün kafir əyan-əşrafı (zadəganları) dedilər: "Biz səni ancaq özümüz kimi (adi) bir insan sayırırq."[26]**

Hz.Musa və Hz.Harunun qövmü barəsində:

فَقَالُوا أَنُؤْمِنُ لِبَشَرَيْنِ مِثْلِنَا وَقَوْمُهُمَا لَنَا عَابِدُونَ ...

**“Onlar (Firon və əyan-əşrafı) dedilər: "Bunlarım tayfası bizə bir qul kimi itaət etdiyi halda, biz özümüz kimi iki adi insana imanmı gətirəcəyik?"[27]**

Səmud qövmü barəsində:

مَا أَنْتَ إِلَّا بَشَرٌ مِثْلُنَا فَأْتِ بِآيَةٍ إِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ ...

**“Sən də bizim kimi ancaq adi bir insansan! Əgər doğru danışanlardansansa (həqiqi peyğəmbərsənsə), bizə (Allahdan) bir möcüzə gətir”.[28]**

*Peyğəmbər əsrinin müşrikləri barəsində:*

---

[26] Hud sürəsi, 27-ci ayə.
[27] Muminun surəsi, 47-ci ayə.
[28] Şuəra surəsi, 154-cü ayə.

وَقَالُوا مَالِ هَٰذَا الرَّسُولِ يَأْكُلُ الطَّعَامَ وَيَمْشِي فِي الْأَسْوَاقِ ...

**“Onlar (müşriklər) dedilər: "Bu necə peyğəmbərdir ki, yemək yeyir, bazarları gəzib dolaşır?"** [29]

Hz.Peyğəmbərin (s) adi bəşərdən fərqini və üstünlük məsələsi hədislərdə də öz əksini tapmışdır.

Hz.Peyğəmbər (s) buyurub: **“Gözüm yatır, lakin qəlbim oyaqdır”.**[30]

Başqa bir hədisdə isə oxuyuruq: **“Ona yerin xəzinələrinin açarı əta olunub”.**[31]

Bəli, bu ayə və rəvayətlərə əsaslanaraq tam əminliklə demək olar ki, peyğəmbərlər və övliyalar bəşər olsalar da belə, adi bəşərdən üstündürlər. Quran onları adi bəşər həddinə salaraq özümüzlə muqayisə etməyi məzəmmət etmişdir ki, yuxarıda qeyd etdiyimiz ayələr buna bariz nümunədir.

---

[29] Furqan surəsi, 7-ci ayə.
[30] Səhih Buxari, c. 4, s.168. تنام عينى ولا ينام قلبى
[31] Səhih Buxari, c.2, s.94. أتيت مفاتيح خزائن الأرض

## Xaliq və məxluq arasındakı müştərək xüsusiyyətlər (sifətlər)

Xaliqin məxluqla bəzi işlərdə şərik olmasının Allahın şəriksiz olması ilə heç bir ziddiyyəti yoxdur. Bu o zaman doğru hesab edilir ki, bütün bu işlərin əsli və kökü Allaha qayıtsın. Ancaq vəhhabilər bunu şirk bilirlər və bu da onların nadanlığından irəli gəlir. Ona görə ki, Allah necə iradə etsə və kimi istəsə fəzilətli edər, onun məqamını başqalarının məqamından fərqləndirib ucaldar. Bir çox mükəmməlliklər vardır ki, Allah-taalanın özünə məxsusdur, ancaq onu öz dostlarına, xüsusən də Peyğəmbər (s) və onun əhli-beytinə də əta edib. Bunlardan bəzilərini qeyd edək:

1. **Şəfaət**.

Allah təala Quranda belə buyurur:

قُلْ لِلَّهِ الشَّفَاعَةُ جَمِيعًا

**“De: “Bütün şəfaət yalnız Allaha məxsusdur!”** [32]

Şəfaət yalnız Allaha məxsus olduğu halda Allah-taala şəfaəti öz iradə və izni ilə başqalarına da əta edərək onlar üçün də sabit edir:

...مَنْ ذَا الَّذِي يَشْفَعُ عِنْدَهُ إِلَّا بِإِذْنِهِ ...

**“Alahin izni olamadan onun yanında (qiyamətdə) kim şəfaət edə bilər?”**[33]

Deməli, ayəyə əsasən Allahın izni olarsa, Qiyamət günü bizə şəfaət edənlər olacaqdır.

**2. Qeyb elmi.**

Allah-taala buyurur:

قُلْ لَا يَعْلَمُ مَنْ فِي السَّمَاوَاتِ وَالْأَرْضِ الْغَيْبَ إِلَّا اللَّهُ ...

**“De: "Allahdan başqa göylərdə və yerdə olan heç kəs qeybi bilməz”**[34]

---

[32] Zümər surəsi, 44-cü ayə.
[33] Bəqərə surəsi, 255-ci ayə
[34] Nəml surəsi, 65-ci ayə.

Amma başqa bir ayədə öz peyğəmbərinin də qeyb elmindən xəbərdar olduğunu bildirərək belə buyurur:

عَالِمُ الْغَيْبِ فَلَا يُظْهِرُ عَلَىٰ غَيْبِهِ أَحَدًا إِلَّا مَنِ ارْتَضَىٰ مِنْ رَسُولٍ

**"Qeybi bilən ancaq odur (Allah) və öz qeybini heç kəsə əyan etməz. Bəyənib seçdiyi peyğəmbərlərdən başqa (Allah istədiyi peyğəmbərə qeybdən xəbərlər verər)".**[35]

**3. Hidayət.**

Allah-taala Özü barəsində **"(Ya Muhəmməd!) Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən ama Allah istədiyini hidayət edər"**[36] buyurduğu halda başqa bir ayədə Peyğəmbərə (s) xitab edərək belə buyurur:

وَإِنَّكَ لَتَهْدِي إِلَىٰ صِرَاطٍ مُسْتَقِيمٍ

**"Həqiqətən sən doğru yola hidayət edirsən"**[37]

**4. Şəfqət və rəhmət.**

---

[35] Cin surəsi, 26-27-ci ayələr.

[36] Qəsəs surəsi, ayə 56. إِنَّكَ لَا تَهْدِي مَنْ أَحْبَبْتَ وَلَٰكِنَّ اللَّهَ يَهْدِي مَنْ يَشَاءُ

[37] Şura surəsi, 52-ci ayə.

Allah-taala öz barəsində belə buyurur:

إِنَّهُ بِهِمْ رَءُوفٌ رَحِيمٌ

**“O, (Allah) həqiqətən də onlara qarşı şəfqətli və rəhimdir”**[38]

Özünü bu xüsusiyyətlərlə vəsf edən Allah eyni halda Peyğəmbər (s) barədə də belə buyurur:

لَقَدْ جَاءَكُمْ رَسُولٌ مِنْ أَنْفُسِكُمْ عَزِيزٌ عَلَيْهِ مَا عَنِتُّمْ حَرِيصٌ عَلَيْكُمْ بِالْمُؤْمِنِينَ رَءُوفٌ رَحِيمٌ

**“Sizə özünüzdən elə bir Elçi gəldi ki, sizin əziyyətə düşməyiniz ona ağır gəlir. O sizə qarşı qayğıkeş, möminlərə şəfqətli, rəhmlidir.”**[39]

Qeyd edilənlərdən belə nəticəyə gəlmək olur ki, Allah iradə edərsə, özünə məxsus olan bəzi xüsusiyyətləri (sifətləri) seçilmiş bəndələrinə də əta edə bilər. Əgər bir kəs Peyğəmbərin (s) yaxud da onun əhli-beytinin belə kamala sahib olduqlarına etiqad edərsə, eynilə həqiqətə etiqad etmişdir.

---

[38] Tövbə surəsi, 117-ci ayə.
[39] Tövbə surəsi, 128-ci ayə.

## Övliyalara təzim (ehtiram) etmək

Vəhhabilər təzim və ibadət arasında fərq qoymayaraq güman edirlər ki, təzimin hər bir növü ibadətdir və bu hər bir şəxsin ibadəti nəticəsində təzimə çevrilir. Onlar Peyğəmbər (s) və Allah övliyalarının qarşısında ədəblə durmağı, əllərini öpməyi, onlara "seyyid", "mövla" müraciətlərini (quluv) həddi aşma və Allahdan qeyrisinə ibadət hesab edirlər.

Bu nadanlar İslam yaranandan indiyə qədər hələ də ibadət ilə təzim arasındakı fərqi ayırd edə bilməyiblər.

Hər bir ibadətdə təzimin olması doğrudur, lakin hər təzim ibadət demək deyildir. İbadətdəki xüzu və təzim istər sözlə (ləfzi) olsun, istərsə də praktiki (əməli), uluhiyyətdən qaynaqlanır. Yəni abid yalnız məbud və ibadətə layiq olan Allah qarşısında təzim edir. Yaxud da abid məbuda onun malik olduğuna görə və yaranış mülkünün sahibi olduğuna görə xüzu və təzim edir. Və ya abid məbuda onun rəbb və həqiqətən ibadətin yalnız ona olunduğuna görə xüzu və təzim edir.

Bu izahla aydınlaşdı ki, ibadətin mənşəyi bu üç şərt yəni, uluhiyyət, malikiyyət və rübubiyyətdir. Ancaq övliyalara olunan xüzu və təzimdə bu üç şərt yoxdur, ola da bilməz. Çünki ifratçılar (qulatlar) məhz elə bu əqidədə, yəni övliyaların üluhiyyət, rübubiyyət və malikiyyət məqamına qail olduqlarına görə dindən çıxaraq kafir oldular. İndiyə qədər də heç bir şiə Peyğəmbər (s), imamlar (ə) yaxud digər övliyalar barədə bu əqidədə olmamışdır. Onların qarşısında xüzu və təzim edərkən də məqsədləri onlara ibadət etmək deyil, ehtiram və hörmət etmək olmuşdur ki, bunların da izahı əvvəlki səhifələrdə qeyd olundu.

Görəsən tarix boyu şiələrə vurulan bu töhmət və böhtanın əsl səbəbi və daşıdığı məqsəd nə olub?! Nəyə görə şiələr Əli (ə) və onun övladlarına məhəbbət bəsləməyə görə daima təzyiqlərə məruz qalaraq dindən çıxmış kimi qələmə veriliblər? Məgər bu şəxslər insanlığın fəxri, bəşəriyyətin müəllimi olan Hz.Rəsulullahın (ə) əhli-beyti deyilmi? Məgər Allahın buyurduğu **“De, sizdən təbliğimin müqabilində öz qohum və əqrabama məhəbbət istəyirəm”** bu ayə onlara şamil deyilmi?

